AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2021, № 4 (270), 55-65
https://dx.doi.org/10.48445/TAIIJ.2021.46.47.005

AZƏRBAYCAN VƏ TÜRKMƏN ƏDƏBİYYATI

# Mirvarid Dilbazinin yaradıcılığında folklorun yeri və rolu

***Sevinc Əliyeva***
Filologiya üzrə fəlsəfə doktoru, aparıcı elmi işçi. AMEA Folklor İnstitutu, "Folklor və yazılı ədəbiyyat" şöbəsi. Azərbaycan.
E-mail: sevinc.k.aliyeva@gmail.com
https://orcid.org/0000-0002-5666-168X

**XÜLASƏ**
Mirvarid Dilbazinin əsərlərində öz ifadəsini tapan, diqqətimizi cəlb edən nə varsa, hamısı cəmiyyətimizdə baş verən hadisələrin tərənnümüdür. Bu baxımdan, onun aktuallığı, yeniliyi ilə hər zaman nəzərə çarpan şeirləri bu gün də kitabsevər, mütaliəyə marağı olan oxucular tərəfindən sevilərək oxunur, həm uşaqların, həm də gənc nəslin sağlam ruhda yetişməsində mühüm rol oynayır. Mirvarid Dilbazinin əsərlərini oxuduqca görürürük ki, onların hər biri orijinal olmaqla bərabər, xüsusi yaradıcılığın məhsuludur. Bu zaman nəzərimizi çəkən bir məqam da var ki, sənətkar əsərlərinin adlarına həssaslıqla yanaşmış, onların mövzu və ideyasından qaynaqlanan xalq ifadəsini başlıq olaraq fərqləndirmişdir. Təhlil zamanı görürük ki, şairənin qələm məhsulundan yaranan bu keyfiyyətlər əsərləri ilə həmahənglik təşkil edir. Zəhmət və həyat eşqindən doğan bu yaradıcılıq yolunun oxucuya aşılamaq istədiyi bir amal var: xeyirxahlıq, sədaqət, düzlük.

**AÇAR SÖZLƏR**
Mirvarid Dilbazi, folklor, yazılı ədəbiyyat, atalar sözləri, xalq ifadələri, uşaq ədəbiyyatı, müharibə mövzusu

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 26.10.2021
qəbul edilib: 01.11.2021

**MƏQALƏNİ ÇAPA MƏSLƏHƏT BİLƏN**
Pedaqogika üzrə fəlsəfə doktoru, dosent Bilal Həsənli.

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2021, NO. 4, VOL. 270, 55-65
https://dx.doi.org/10.48445/TAIIJ.2021.46.47.005



# The place and role of folklore in the works of Mirvarid Dilbazi

***Sevinj Aliyeva***
PhD in Philology, Leading researcher. "Folklore and written literature" department of the Institute of Folklore of ANAS. Azerbaijan.
E-mail: sevinc.k.aliyeva@gmail.com
https://orcid.org/0000-0002-5666-168X

**ABSTRACT**
Everything that finds its expression in the works of Mirvarid Dilbazi and attracts our attention is a hymn to the events that took place in our society. From this point of view, the relevance and novelty of Mirvarid Dilbazi's poems are always noticeable. Mirvarid Dilbazi's works are still read with interest by book-loving readers, who play a role in the healthy upbringing of both children and the younger gene-ration. It is not so easy to study the work of Mirvarid Dilbazi in the true sense of the word. As we read and analyze the works, we see that each of them is original and a product of special creativity. There is a point in Mirvarid Dilbazi's work that the artist was sensitive to the names of his works and distinguished the national expression derived from the theme and idea of each work as a title. As we analyze, we see that these qualities from Mirvarid Dilbazi's pen experience are in harmony with his creativity. There is one thing that Mirvarid Dilbazi's creative way, born of hard work and love of life, wants to instill in the reader: kindness, loyalty, honesty.

**KEYWORDS**
Mirvarid Dilbazi, folklore, written literature, proverbs, folk expressions, children's literature, war theme

**ARTICLE HISTORY**
Received: 26.10.2021
Accepted: 01.11.2021

## Giriş / Introduction

XIX əsrin 30-cu illərindən başlayaraq, yetmiş illik zəngin yaradıcılıq yolu keçən Xalq şairi Mirvarid Dilbazi müasir Azərbaycan ədəbiyyatının tanınmış sənətkarlarından biridir. Onun adlarını nümunə kimi göstərəcəyimiz aşağıdakı kitablarında da fikrimiz öz təsdiqini tapır: “Mən hədiyyəyəm” (1948), “Balaca nümayəndə” (1950), “Qardaşlar” (1955), “Seçilmiş şeirləri” (1957), 2 cildlik “Seçilmiş əsərləri” (1967-1968). Kitablarını oxuyub təhlil etdikcə, bir daha əmin oluruq ki, Mirvarid Dilbazi əsərlərini insan qüdrətinin əzəmətinə, xeyirxah, zəhmətkeş insanların tərənnümünə həsr etmişdir. Şairənin uşaqlar üçün yazdığı “Günəş”, “Yaz yağışı”, “Yaz buludu”, “Göy gurlayır”, “Yaz gəlir”, “Açıl bənövşə”, “Bahar bayramı”, “Şəlalə”, “Həkim təbiət” və s. şeirlərində təbiət gözəlliyinin tərənnümü ilə yanaşı, xalqın ruhu, xalq ifadəsinin təsviri bu gün də qorunub saxlanılmaqdadır. Dəyərli sənətkar folklor nümunələrinin bütün imkanlarından istifadə etməklə yaratdığı əsərlərə incə ruhlu ahəng qatmışdır. Bu keyfiyyətlər Mirvarid Dilbazi yaradıcılığına marağı daha da artırır. 1984-cü ildə qələmə aldığı “Mən ölmək istəmirəm” fikrinin əks olunduğu şeirində deyildiyi kimi:

Qoca köklər üstündə
Olur meyvəli budaq,
Mən ölmək istərəm,
Gözlə, məkanım torpaq.

Bir bəndini qeyd etdiyimiz bu şeirdə əvvəldən sonadək folklorla fəlsəfi fikrin gücü bir-birini əvəz edir. 3-cü misrada isə “Mən ölmək istərəm”, – söyləyən sənətkar hər iki xalq düşüncəsinə aid poetik mənzərənin əzəmətini aydın şəkildə göstərir [2, s.170]. 1996-cı ildə yazdığı “Əhval-ruhiyyə” adlı şeirində ifadə etdiyi “Yaşıl yarpaq sabah sarı xəzəldir” misrasında xalqımızın illərdən bəri qoruyub saxladığı folklor nümunəsi öz poetik təsvirini tapmışdır. Şeirdən aşağıdakı bəndə diqqət yetirək:

Sonu olan planetdə yaşaram,
Gah susaram, gah kükrərəm, daşaram,
Aldadılmış bir uşağa oxşaram,
Yaşıl yarpaq sabah sarı xəzəldir,
Fani dünya niyə belə gözəldir?
[2, s.184].

“Qaranquş”, “Torağay”, “Sığırçın”, “Hop-hop”, “Cik-cik”, “İsti yuvada”, “Sarı qulan”, “Boz oğlağım”, “Çiçək yelləncək”, “Durnalar” şeirlərində də həm şairənin, həm də oxucunun heyvan və quşlara olan məhəbbəti xalq ruhuna söykənir. F.Köçərli adına Respublika Uşaq Kitabxanasında hazırlanan “Vətənin qüdrətindən güc alan sənətkar” adlı metodik vəsaitdə də yazıldığı kimi: “M.Dilbazi torpağa bağlı, el-obaya söykənən xalq zəmanətli, xalq dəyanətli, zəhmətkeş bir şairədir. O, uşaqların və yeniyetmələrin də sevimli şairəsi olmuş, yaradıcılığının böyük bir qismini onlara həsr etmiş, yalnız şairə kimi deyil, eyni zamanda bir ana, bir müəllimə kimi də uşaqların təlim-tərbiyəsində həmişə özünü cavabdeh hesab etmişdir. “Tarla mahnısı”, “Sünbülün mahnısı”, “Ayların söhbəti”, “Tapın görüm hansı quşam” və s. şeirləri uşaqların sevərək oynadığı kəpənəklər kimi, sevib dərdikləri çiçəklər kimi, qovub oynadıqları nəğməli quşlar kimi gözəldir. Bunlarda uşaq aləminə yeni əşya və hadisələr təqdim olunub, onlara bilik, zövq, yeni anlayış aşılanmışdır” [4, s.26]. “Tapın görüm hansı quşam” şeirinin tapmaca-şeir formasında yazılmağı isə folklorun insan ruhunun, fikir və düşüncələrinin ifadəsi üçün nə qədər böyük gücə malik olduğunu bir daha göstərir.

“Mirvarid Dilbazinin ilk mətbu şeiri 1927-ci ildə işıq üzü görmüş “Qadınların hürriyyəti”, ilk kitabı isə 1934-cü ildə nəşr edilmiş “Bizim səsimiz”dir. Sonrakı illərdə “Vətən eşqi”, “Xatirələr”, “Bahardan məktub”, “Nağıllar”, “Gülbahar”, “Lalənin ağacları” kitabları çapdan buraxılıb. Şairənin “Məhsəti”, “Əlcəzairli qız”, “Partizan Aliyə” poemaları, “Göyçək Fatma”, “Muğanda bahar” və s. əsərləri oxucu auditoriyası qazanmış sənət nümunələridir. 1967-1968-ci illərdə Mirvarid xanımın iki cilddə, 1982-1983-cü illərdə isə üç cilddə “Seçilmiş əsərləri” böyük tirajla çap edilib. “Poeziyasında quru, adamı utandıracaq bir misra belə olmayan” (Məmməd Namaz) Mirvarid Dilbazi həm də nəğməkar şairə idi. Bəstəkar Ağabacı Rzayeva onun “Çoban Qara”, “Evimizə gəlin gəlir”, “Anam yadıma düşdü”, “Laylay”, “Azərbaycan elləri” şeirlərinə dillər əzbəri olan, könülləri oxşayan mahnılar bəstələmişdir. M.Dilbazi dünya və türk xalqları ədəbiyyatından etdiyi tərcümələrlə də tanınmışdır” [3, s.6].

Tanınmış şairənin şeirlərində “ana”, “torpaq”, “yurd” sözlərinin mənaları çox dərindir. Doğma el-oba daşı-torpağı, insanları ilə onun yaradıcılığında incəliyinə qədər tərənnüm olunmuşdur. Yeri gəlmişkən qeyd edək ki, torpağa bağlılığın bu cür dərin sevgi ilə nəzmə çəkilməsində sənətkarın nəzəri mülahizələri də böyük rol oynamışdır. Mirvarid Dilbazinin ürəyi hər zaman vətən eşqi ilə çırpınıb. Yaradıcılığını öyrəndikcə, dəyərli şairəmizin təbiət gözəlliklərinə vurğunluğunun bir daha şahidi oluruq. “İnsan olmaz mən dözümdə”, “Od söndü, külüm qaldı”, “Od üstündə çiçək bitməz”, “Qadının əri gərək” əsərlərində isə xalqı vətəndə baş verənləri

olduğu kimi qiymətləndirməyə, zülmətə, düşmənə qarşı birlik göstərib mərd olmağa səsləmişdir. Sənətkar burada da folklor nümunələrinə istinad etmişdir. Onu da qeyd edək ki, müxtəlif janrlı folklorumuzun böyük bir qismini folklor ifadələri, xalq deyimləri, xalq hikməti tutur. Tarixi çox qədim olan xalq deyimləri bədii cəhətdən də çox mükəmməl olub, yazılı ədəbiyyat nümunələrimizdə qorunaraq bu günümüzə kimi gəlib çatmışdır. Bu isə Azərbaycan xalqının qədim və zəngin folklorunun təbliğinin nəticəsidir. “Qarğa bülbül yuvasında” şeirində də aydın görünür ki, burada xalq ifadəsi uğurla əks olunur və bu ifadə əsərə bir canlılıq, şəffaflıq gətirir:

Tikan gördüm gül yerində,
Cırtdan gördüm fil yerində,
Dedilər yum gözlərini,
Di, get, yıxıl, öl yerində.
Qarğa bülbül yuvasında,
Bülbüllük iddiasında,
Gözüm qan ağlar, qarğalar,
Uçsa vətən səmasında
[2, s.173].

“Od üstündə çiçək bitməz” əsəri isə xalqımızın duyğularını, dünyaya baxışını özündə əks etdirir. Folklordan süzülüb gələn deyim və səmimiyyət ilə zəngin olan bu əsərdə sənətkar “Gül solubdur, bülbül ötməz” misalını nümunə çəkərək, məna ilə formanın vəhdətinə daha çox önəm vermişdir:

Sən o tayda,
Mən bu tayda,
Körpüsüzdür dərin çay da,
Çağırıram hey, nə fayda
Sənə səsim, ünüm yetməz.
Ağlar söyüd bu sahildə,
Yarpaq açar, tökər ildə.
Adın alovlanır dildə,
Od üstündə çiçək bitməz,
Göy guruldar, şimşək çaxar,
Selləri gözümdən axar,
Gəldi yenə gözəl bahar,
Gül solubdur, bülbül ötməz.

Mirvarid Dilbazi xalq yaradıcılığının hikmətini, aforizmini "Sarı sünbül", "Tarla mahnısı", "Biçin nəğməsi", "Ulduzları fəth edən qız", "Həcər xalça toxuyur", "Babanın nəğməsi", "Ata və oğul", "Məhəbbət karvanım" şeirlərində də yaşatmışdır. Əsərlərdə müxtəlif bədii boya və üsullarla təsvir olunmuş xalq hikməti ağsaqqallarımızın keçmişdən bu günümüzə kimi bizlərə miras kimi ötürdükləri həyat məktəbidir və bu hikmət oxucunu əxlaqi-tərbiyəvi təsir altında saxlayır. "Məhəbbət karvanım" şeirində diqqətimizi çəkən "Mən gülü tikana qata bilmərəm" hikməti də böyük dostluğa, sevgiyə geniş imkanlar açır:

Məhəbbət karvanım uzağa getdi,
Ha qaçım dalınca, tuta bilmərəm,
Gənclik gülşənimdə tikanlar bitdi,
Mən gülü tikana qata bilmərəm, – söyləyən sənətkar gənclərin insanlığa, bəşəriyyətə məhəbbət ruhunda tərbiyə olunmasında böyük rol oynamış olduğunu təsdiq edir [2, s.162]. Qeyd etdiyimiz kimi, maraqlı və təqdirəlayiq hal budur ki, bu təbliğat xalq hikməti vasitəsilə aparılır, xalq ədəbiyyatı ilə birgə təqdim olunur.

Şairənin 7 bənddən ibarət "Getmək üçün gəlmişik biz" başlıqlı şeirində isə, insan ömrünə xas olan, dünyada əsrləri, qərinələri ötürmüş dəyişməz qanunlar sadalanır, nizamla düzülür. Bu qaydalar insanlara var-dövlətə tamah salmamağı, namuslu, qeyrətli olmağı, insani dəyərləri üstün tutmağı nəsihət edir. Şairə həmişə olduğu kimi yenə də folklorumuzdan, xalq ifadələrindən nümunə çəkərək şəxsiyyəti, şərəfi, igidliyi, yoxsulluğu, bir sözlə, hər mənada insanlığı uca tutmağı oxucudan aşağıdakı kimi təvəqqe edir:

Olma var-dövlətə müştaq,
Tamah səni edər dustaq,
Nə var dünyada qalacaq,
Getmək üçün gəlmişik biz.

Dünya şirin, biz gözü ac,
Başlardan düşdü neçə tac,
Ölümə kim tapmış əlac,
Getmək üçün gəlmişik biz.

Düşün, aclar, yoxsullar var,
Həm ağalar, həm qullar var,
Başdan-başa keçdi taclar,
Getmək üçün gəlmişik biz
[2, s.102].

Uşaqların ruhuna daha yaxın olan "Bakının işıqları", "Könlüm sevinməsinmi?", "Abşerona gələn sular", "Xəzər üstə şəhərim var", "Bizim yurdun", "Ölkəm", "Sülhdür andımız", "Uşaqlar qəmlənməsin", "Xatirə" və digər bu tip şeirləri vasitəsilə Mirvarid Dilbazi xalq yaradıcılığının hikmətini, aforizmini yurd, torpaq, el-oba məhəbbətini, müharibəyə nifrəti, sülhə çağırışı kiçik oxucularına qavradır, mənimsədir. M.Dilbazi yaradıcılığının bütün istiqamətlərdə təhlili bunu göstərir ki, dəyərli sənətkar istənilən mövzuya həsr etdiyi əsərlərində folklora istinad edir. Çünki folklor tükənməz bir xəzinədir. Məhz buna görə onun şeirləri öz təbiiliyi, ürəyə, dilə yatımlılığı ilə seçilir. "Sevgi pərisi", "Mənim anam ürəyimdir", "Analıq duyğusu", "Şirin dilim", "Körpələr", "Dilarə və Gülarə", "Vicdan", "Ana dili", "Məktəb nəğməsi", "Birinci beş", "Gələcək müəlliməyə məktub" şeirləri gözlərimiz önündə üfüqləri geniş olan bir dünya yaradır, ifadə olunmuş ana dili, analıq duyğusu, dostluq, yoldaşlıq, məktəb illəri kimi mənəvi keyfiyyətlər bizi özünə çəkir və bu ilahi mənanı qavramaqla, oxucu bədii düşüncə dəyərini bir daha artırmış olur:

Qoca çinarın kölgəsində,
Qoca ürəyin ölkəsində,
Yatan pəri qızı oyansa əgər,
Bu miskin ölkəni tərk edib gedər
[2, s.185].

Mirvarid Dilbazinin mənzum nağılları və poemaları da bədii zövqümüzün daha səlis formalaşması üçün hesablanmış əsərlər, gənclərə qol-qanad, ruh yüksəkliyi verən ən gözəl nümunələrdir. Bu istiqamətdə "Avey dağla söhbət", "Kor şair", "Dağlar", "Həyatımdan sətirlər", "Bu bəla hardan gəldi", "Sazişlər", "Neçə eldən", "Əskipara", "Qaratel", "Reyhan", "Balaca nümayəndə", "Xeyir və şər", "Qardaşlar", "Balaca dostlarım", "Sevincin dünyası", "Babaların su həsrəti" poemalarının adlarını qeyd edə bilərik. "Torpağı bölünməz, varı yeyilməz!" atalar sözünün təsdiqini tapdığı "Kor şair" poemasından olan kiçik bir nümunəyə diqqət yetirək:

Qurd içindən yeyir ağacı, heyif!
Bunu bizdən əvvəl atalar deyib.
Milləti içindən yeyən olmasa,
Millət əyilməz,
Torpağı bölünməz, varı yeyilməz!
[2, s.208].

Göründüyü kimi, tanınmış şairənin uşaqlar üçün yazdığı əsərlərin də məramı, məqsədi torpağa, xalqa sevgi və eyni zamanda tərbiyə məsələləridir. “Mənim milli dərdimizə, milli ordumuza, qəhrəman oğullarımıza həsr etdiyim bu əsərlər torpaq fəryadı, xalqımızın mətanəti və ordumuzun qəhrəmanlığının tərənnümüdür”, – deyən müəllif böyük sənətkarlıq gücü ilə bu məsələləri əsərlərində təsvir edib [2, s.5].

Qeyd etdiyimiz kimi, Mirvarid Dilbazinin yaradıcılığında alleqorik mənzum nağıllar da əhəmiyyətli dərəcədə yer tutur. Xeyir və Şərin mübarizəsi, yaşamaq eşqi, qoçaqlıq, qəhrəmanlıq kimi həyati keyfiyyətlərin yer aldığı bu alleqorik əsərlər sabaha nikbin ümidin əksidir: “Günəşin eşqi”, “Qaranquş və qara ilan”, “Qurd və uşaqlar”, “Bal arısı və eşşək arısının nağılı”, “Lalənin ağacları” [1, s.11]. Eyni zamanda zəhmətin insan həyatında vacib rol oynadığını tərənnüm edən bu alleqorik mənzum nağıllar əməksevər kütlənin fikir və düşüncələrinə daha yaxındır. Sənətkarın mənzum nağılları həm də səhnələşdirilərək tamaşaçılara təqdim edilmişdir. Onların sırasında nümunə olaraq qeyd etdiyimiz “Lalənin ağacları” alleqorik mənzum nağılında böyük əxlaqi və tərbiyəvi əhəmiyyətə malik səhnələr çoxdur. Bu alleqorik mənzum nağıl əsasında hazırlanmış tamaşada nənə, tut və əncir ağaclarının dialoquna diqqət yetirək: “Səhnə söyüd, tut, əncir və iydə ağaclarının şəkli ilə bəzədilir. Hər bir ağacın adından bir oxucu danışır. Nənə əlində beşik gəlib söyüd ağacının altında oturur. Beşiyi yelləyib körpə Laləni yatızdırmağa çalışır.

*Söyüd:* Qıza baxın, qıza baxın! Necə də körpədir. Lap mənim kimidir.

*Aparıcı:* Söyüd ağacının budaqları yelləndikcə, Lalə əllərini oynadırdı. Nənə beşiyi yırğalayır, amma Lalə yatmırdı. Nənə onu tut ağacının altına apardı.

*Tut:* Ay qəşəng bala, şəkərli tutlarım var, yeyəsən, doşabıma şirin deyəsən, gəlişin xoşdur, qoynum-qucağım boşdur. Mayda çiçəkləndim, iyunda dərildim, günəşə sərildım.

*Aparıcı:* Lalənin tut ağacına yazığı gəldi. Dodaqlarını büzdü, gözləri yaşla doldu, “inqa” – deyib ağladı. Yenə yatmadı. Nənə onu əncir ağacının altına apardı.

*Əncir:* Mənim sevincim çoxdur, dərdim-qəmim yoxdur, ballı əncirlərim dərilməyib, qurudulmaq üçün günə sərilməyib, beşiyin üstə sapsarı inci düzəcəm, ağzımdan bal damacaq, quşlar məndən pay umacaq [1, s.10].

Bunlardan əlavə, “Gözəl ana”, “Nənənin dərsi”, “Cavan qız və qoca qarının hekayəsi”, “Muğanda bahar”, “Göyçək Fatma”, “Xocalı fəryadı”, “Məhsəti” pyesləri də ədəbiyyatımızda folklorla yazılı ədəbiyyatın əlaqəsini göstərən, xalq ifadələri, atalar sözləri və aforizmlərlə zəngin olan nümunəyə layiq dəyərli əsərlər sırasındadır. Şairin 1996-cı ildə yazdığı ikipərdəli pyesi söylədiklərimizin əyani nümunəsidir. Əsərdə orta məktəb şagirdi Fərhadın dilindən söylənilən “Sirkə tünd olanda, öz qabı çatlar” atalar sözünün də yer aldığı aşağıdakı şeir parçasına diqqət yetirək:

Susdurulmuş əzanlarçün,
Yandırılmış Quranlarçün,
Düzlənən qəbiristanlarçün,
Bu, Xocalı tufanıçün!
Bu, Şəhidlər qanı üçün
Alın cəlladlar!
Sirkə tünd olanda öz qabı çatlar,
Alın! Xocalının bəxşeyişidir!
Burada uşaqlar da bilin, kişidir.
Vətəni qorumaq kişi işidir, – söyləyən sənətkarımız qəlbindən keçən ağrılı duyğu və düşüncələrini məhəbbətlə qələmə alıb. Bu nümunələr sadə, eyni zamanda yüksək epik-lirik xarakterə malik ədəbiyyat inciləridir. Tarixə “Xocalı faciəsi” kimi həkk olunan və M.Dilbazinin bu mövzuda olan hər bir misrası da vətənin başına gətirilən faciədən doğur, acı taledən qaynaqlanır. Heç vaxt şöhrət arzusunda olmayan şairənin yazdıqları sadəcə könlünün sirdaşına dönərək süzülən söz və duyğularının ifadəsi deyil, xalqımızın yaşadığı faciənin olduğu kimi qələmə alınmasıdır. Məhz bu səbəbə, əsər insanı mərdliyə, saflığa, halallığa, mübarizliyə, yaşayıb-yaratmağa səsləyir. Onu da xüsusi qeyd edək ki, “Biz od üstündə doğulduq”, “Öpün, bu qanlı torpağı” söyləyən və yaradıcılığı zəngin olan sənətkarın əsərlərində müharibənin təsir və əlamətləri özünü daim biruzə verir. Bu isə müəllifin vətən, yurd, torpaq sevgisi ilə bağlıdır. “Hər qaranlıq gecənin bir işıqlı səhəri var. O işıqlı səhərdə yetişən yeni, ziyalı nəsillər rahatsız günlərimin, yuxusuz gecələrimin məhsulu olan bu “torpaq” fəryadını xalqımıza çatdıracaq, fəryad dolu kitabın bir nüsxəsi isə məzarım üstə qoyulacaq” [2, s.5]. Şairənin 1998-ci ildə söylədiyi bu

fikirlərdən də görünür ki, "torpaq" fəryadı ilə alışıb-yanan sənətkar vətəninin, xalqının taleyindən çox nigarandır, amma sabaha, işıqlı gələcəyə ümidi böyükdür.

Mirvarid Dilbazinin əsərlərində öz ifadəsini tapan, diqqətimizi cəlb edən nə varsa, hamısı cəmiyyətimizdə yaşanmış tale və hadisələrin tərənnümüdür. Təhlilini apardığımız bu qeydlərin aydın ifadəsini "Od söndü, külüm qaldı", "Dağ kimi görünür səhrada təpə", "Düşmənə qardaş desən", "Azadlıq qurban verir", "Tək ağac", "Getmək üçün gəlmişik biz", "Milyonçunun yoxsul qızı", "Haqq və ədalət", "Vətən oğul istəyir", "Oğul olanda da olasan qoçaq", "Ağlar elsiz qalan dağlar", "Qarğa bülbül yuvasında", "Məhəbbət köçəri quşdur", "Vətən oğulsuz olmasın", "Bu millət sonsuz deyil", "Heç igid yolsuz olmasın", "Kədərli şairlik yolunu seçdim", "Mən kədər mülkində şaham" kimi nümunələrlə də təsdiq edə bilərik. Əsərləri oxuyub təhlil etdikcə görürük ki, xalqdan qaynaqlanan bu hikmətli, məntiqli ifadələrin hər biri sənətkarın əsərlərini tamamlayır. Onlar şairənin bədii yaradıcılıq məhsulu kimi uğurlu və mənalıdır. Ona görə ki, bu xalq ifadəli, xalq məzmunlu başlıqlar folklor nümunəsi olaraq tarixi bir inkişaf yolu keçmişdir. Mirvarid Dilbazi hər qarışı şeir, nağıl, bayatı, bir sözlə, tarix və folklor olan vətənini çox sevən və bütün həyatını ona bağlamış sənətkardır. "Qanlı yanvar", "Nigaranlıq içindəyəm", "Şəhidlərin ildönümü", "Ağlama, gəlinim, qızım, ağlama", "Baş və dil", "Vətən qəhrəmanları", "Ağlar qalan Göyçə", "Dağ kimi görünür səhrada təpə", "Qarabağdan köçən quşlar", "Azərbaycanım", "Vətən oğul istəyir", "Bu millət sonsuz deyil", "Sazlı-sözlü Qarabağ", "Milyonçunun yoxsul qızı" və digər şeirlərinin hər birində sənətkarın xalq, vətən sevgisi ilə bərabər, vətən övladının yurda bağlılığı təsvir olunur. Yuxarıda qeyd etdiyimiz "Vətən oğul istəyir", "Bu millət sonsuz deyil", "Dağ kimi görünür səhrada təpə" kimi xalq ifadəsi başlıqlı şeirlərin də hər biri insanı əməyə, zəhmətə, mübarizəyə səsləyir, gənclərə "dağı dağ üstə qoymaq" həvəsi aşılayır. Xalq şairi Məmməd Arazın dediyi kimi, Mirvarid Dilbazi poeziyası bu günün bioqrafiyasının bir hissəsi kimi, gələcək nəslə öz sözünü deyəcəkdir [1, s.6].

Prof. Rüstəm Kamalın da fikirlərində böyük sənətkarın şəxsiyyəti öz yüksək ifadəsini tapmışdır: "Mirvarid Dilbazi yalnız ədəbiyyatımızın obrazı deyil, həm də milli mənəviyyatımızın və əxlaqımızın obrazıdır" [3, s.7].

Akademik Bəkir Nəbiyev onun mövqeyini müasirləri olan qadın sənətçilər arasında belə dəyərləndirib: "Mirvarid Dilbazi ilhamını xalqdan, onun mənalı keçmişindən, səadətli bu günündən və daha parlaq gələcəyindən alan böyük istedad sahibidir. Gözəllik daşıyıcılarının və gözəlliyi yaradanların bu qvardiyasına başçılıq etmək şərəfi istedadlı Xalq şairi Mirvarid Dilbaziyə nəsib olmuşdur" [3, s.10]. Bu

fikirlər təsdiq edir ki, sənətkarın yaradıcılığındakı əsas məziyyətlərdən biri, onun əsərlərində xalq ədəbiyyatı xəzinəsinə, zəngin aforizm və deyimlərə geniş yer ayırmasıdır. Məhz qeyd etdiyimiz bu xüsusiyyətlər göstərir ki, Mirvarid Dilbazinin əsərləri zəngin və mənalıdır.

## Nəticə / Conclusion

Məqalənin yekunu olaraq qeyd edək ki, apardığımız təhlil və araşdırmada Mirvarid Dilbazi yaradıcılığında folklor məsələləri haqqında elmi mülahizə və nəticələr yekunlaşdırılmış, bu mövzunun gələcəkdə daha geniş formatda elmi müdafiəsi və tədqiqi üçün perspektiv tədqiqat istiqamətləri göstərilmişdir. Məqalədə yığcam olaraq xalq deyimləri və aforizmlərin Azərbaycan yazılı ədəbiyyatına transformasiyası haqqında sistemli şəkildə məlumat da verilmişdir. Folklorda aforizm və xalq deyimləri, el məsəlləri kifayət qədər əhatəli və olduqca geniş bir mövzu, həm də tədqiqatına bütün dövrlərdə ehtiyac duyulan problemdir. Ümumiyyətlə, qeyd etməliyik ki, folklor milli-mənəvi dəyərlərin, mədəniyyətin, reallığın, adət-ənənələrin, təlim-tərbiyə xüsusiyyətlərinin əks olunduğu əsas strukturdur. Hər bir dövrdə yaşayıb-yaratmış şair və yazıçılarımızın yaradıcılığında folklorun özünəməxsus yeri vardır. Mirvarid Dilbazi də məhz bu cür dəyərli şairələrdəndir. Əsərlərinin hər misrasında əks olunmuş folklor nümunələri onun yaradıcılığının həm poetik gücünü, həm də süjet xəttini genişləndirir.

## İstifadə edilmiş ədəbiyyat / References

1. Elə böyük xalqın qızıyam ki mən (Metodik vəsait). Xalq şairi Mirvarid Dilbazinin anadan olmasının 100 illiyi münasibətilə. (2012). F.Köçərli adına Respublika Uşaq Kitabxanası. Bakı, 15 s.
2. Dilbazi M. (2004). Seçilmiş əsərləri. Bakı, Lider nəşriyyatı. 280 s.
3. Sözə bağlı ömür – Mirvarid Dilbazinin 100 illik yubileyinin keçirilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin Sərəncamı. (2012). Sumqayıt şəhəri, Səməd Vurğun adına Mərkəzi kitabxana. 20 s.
4. Vətənin qüdrətindən güc alan sənətkar (Metodik vəsait). (2017). Tərtib edən: L.Qənbərova. F.Köçərli adına Respublika Uşaq Kitabxanası. Bakı, 38 s.